# HEYDƏR ƏLİYEV DƏRSLƏRİ

**Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyi münasibətilə ADPU-nun Heydər Əliyev Mərkəzində silsilə dərslər keçirilir.**





Martın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Heydər Əliyev Mərkəzinin təşkilatçılığı ilə Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyi münasibətilə universitetin I tədris ili tələbələri üçün "Heydər Əliyev dərsləri"nə start verilib. Tarix və coğrafiya fakültəsinin TAR2201B qrupunda "Heydər Əliyev dərsləri"nin ilk məşğələsi keçirilib. Qeyd edilib ki, bu il Ümummilli Lider, müstəqil Azərbaycan dövlətinin qurucusu, görkəmli dövlət xadimi Heydər Əliyevin anadan olmasının 100 ili tamam olur. Azərbaycan Respublikası Prezidentinin ötən il sentyabrın 29-da imzaladığı Sərəncamla 2023-cü il "Heydər Əliyev İli" elan edilib. Dövlət başçısının digər Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında 2023-cü ilin "Heydər Əliyev İli" elan edilməsi ilə bağlı Tədbirlər Planı"nın 12-ci bəndində isə il ərzində təhsil müəssisələrində "Heydər Əliyev dərsləri"nin keçirilməsi nəzərdə tutulub. Bu gün ADPU-da həmin dərslərin ilk məşğələsi başlayır. İlin sonunadək universitetin bütün fakültələrinin tələbələri üçün Heydər Əliyevin həyat və fəaliyyətinə həsr olunmuş dərslər keçiriləcəkdir.

Mərkəzin əməkdaşı tələbələri mərkəzdə nümayiş etdirilən kitab, foto, arxiv sənədlərinin surətləri və digər materiallarla tanış edib, onlara Heydər Əliyevin həyat və fəaliyyətinin əsas məqamları barədə məlumat verib.

Daha sonra mərkəzin müdiri Tahir Süleymanov "Azərbaycan tarixinin Heydər Əliyev mərhələsi" mövzusunda məruzə ilə çıxış edib. Məruzəçi qeyd edib ki, Heydər Əliyev Azərbaycan xalqının yetirdiyi ən parlaq şəxsiyyətlərdən və görkəmli dövlət xadimlərindən biridir. Fenomenal yaddaşa, geniş dünyagörüşünə, yüksək natiqlik qabiliyyətinə, tükənməz enerjiyə və nəhəng idarəçilik təcrübəsinə malik olan Heydər Əliyev Azərbaycana iki dəfə uğurla rəhbərlik edib, Sovet İttifaqının ali partiya və dövlət rəhbərlərindən biri səviyyəsinə yüksəlib. Onun ilk dəfə rəhbərlik etdiyi 1969-1982-ci illərdə Azərbaycan əksər göstəricilərə görə SSRİ-nin 15 respublikası arasında qərarlaşdığı sonuncu pillələrdən qabaqcıl mövqelərə çıxıb, əhalinin rifahı əsaslı şəkildə yaxşılaşıb, təhsilin, səhiyyənin, ədəbiyyat və incəsənətin inkişafı sahəsində nəzərəçarpacaq nailiyyətlər əldə edilib. Heydər Əliyev Moskvada işlədiyi 1982-1987-ci illərdə də doğma Respublikaya xüsusi diqqət və qayğısını əsirgəməyib. Ulu Öndərin Azərbaycana ikinci dəfə rəhbərlik etdiyi 1993-2003-cü illəri xaos və anarxiyadan ictimai-siyasi sabitliyə, tənəzzüldən davamlı inkişafa aparan dövr kimi səciyyələndirmək olar. Heydər Əliyevin ölkə qarşısında xidmətləri o qədər böyükdür ki, 1969-2003-cü illər haqlı olaraq "Azərbaycan tarixinin Heydər Əliyev mərhələsi" adlandırılır.

Məruzədən sonra dünyanın tanınmış dövlət rəhbərlərinin, görkəmli politoloq və yazıçıların Ulu Öndər haqqında söylədiyi fikirləri əks etdirən slaydlar nümayiş etdirilib. Daha sonra dərsin iştirakçıları Heydər Əliyevə həsr olunmuş sənədli filmə tamaşa ediblər.

Sonra məşğələ sual-cavab formasında davam edib, Ümummilli Liderin həyat və fəaliyyətinin müxtəlif aspektləri ilə bağlı məsələlər ətrafında fikir mübadiləsi və müzakirələr aparılıb.

Eyni zamanda davam edən məşğələlərdə tələbələr mərkəzdə nümayiş olunan eksponatlarla tanış ediliblər. Qeyd olunub ki, mərkəzdə Ulu Öndərlə bağlı 400-ə dək foto, arxiv sənədinin surəti, kitab, jurnal, məcmuə və digər əşyalar qorunub saxlanılır. Dərslərin əvvəlində tələbələrə mərkəz haqqında ümumi məlumat verilib. Bildirilib ki, bina Ulu Öndərin vəfatından bir neçə il sonra - 2007-ci ildə inşa edilərək müvafiq avadanlıqlarla təchiz olunub. Burada Heydər Əliyevin həyat və fəaliyyətinin müxtəlif dövrlərini əks etdirən 181 kitab, 169 foto, 13 arxiv sənədinin surəti, 12 suvenir və digər eksponatlar toplanıb. Mərkəzin əsas vəzifəsi Ümummilli Liderə aid materialları sistemləşdirmək və nümayiş etdirmək, müxtəlif səpkili tədbirlər keçirməklə onun zəngin həyat yolunu, ideya-siyasi irsini və dövlətçilik təcrübəsini universitetin əməkdaşları, tələbələri, qonaqları və tərəfdaşlıq etdiyi ümumtəhsil məktəblərinin şagirdləri arasında təbliğ etməkdir.

Layihə çərçivəsində may ayının 6-da ADPU-nun Şamaxı filialının tələbələri də Heydər Əliyev Mərkəzinə ekskursiya ediblər. Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyinin qeyd olunması ilə bağlı Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialında təsdiq edilmiş Tədbirlər Planına uyğun olaraq, filialın sosial və humanitar məsələlər üzrə direktor müavini Şəlalə Seyidovanın rəhbərliyi ilə tələbələrdən bir qrupu ADPU-nun II tədris korpusunda yerləşən Heydər Əliyev Mərkəzini ziyarət edib.

Tələbələr mərkəzdə nümayiş etdirilən kitab, foto, arxiv sənədlərinin surətləri və digər materiallarla tanış olub, onlara Heydər Əliyevin həyat və fəaliyyətinin əsas məqamları barədə ətraflı məlumat verilib.

Çıxışlarda qeyd edilib ki, Heydər Əliyev Azərbaycan xalqının öz çoxəsrlik tarixində yetirdiyi ən parlaq şəxsiyyətlərdən və görkəmli dövlət xadimlərindən biridir. Fenomenal yaddaşa, geniş dünyagörüşünə, yüksək natiqlik qabiliyyətinə, tükənməz enerjiyə və nəhəng idarəçilik təcrübəsinə malik olan Heydər Əliyev Azərbaycana iki dəfə uğurla rəhbərlik edib, Sovet İttifaqının ali partiya və dövlət rəhbərlərindən biri səviyyəsinə yüksələ bilib. Çıxışlardan sonra dünyanın tanınmış siyasi və dövlət xadimlərinin Ulu Öndər haqqında söylədiyi fikirləri əks etdirən slaydlar, habelə Heydər Əliyevə həsr olunmuş sənədli film nümayiş etdirilib.

Sonda Ümummilli Liderin həyat və fəaliyyətinin müxtəlif aspektləri ilə bağlı məsələlər ətrafında fikir mübadiləsi və müzakirələr aparılıb.

Qeyd edək ki, mart-may aylarını əhatə edən 3 aylıq dövr ərzində Tarix və coğrafiya fakültəsi və Məktəbəqədər təhsil fakültəsinin bütün I tədris ili tələbələri üçün "Heydər Əliyev dərsləri" təşkil olunub. Təqvim ilinin sonunadək "Heydər Əliyev dərsləri" ADPU-nun digər fakültələrinin I kurslarında da keçiriləcəkdir.

# Ümummilli Lider Heydər Əliyev – elm və təhsilin himayədarı

Martın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kitabxana-İnformasiya Mərkəzində elm və innovasiyalar üzrə prorektor, fizika-riyaziyyat elmləri doktoru, professor Asəf Zamanovun "Ümummilli Lider Heydər Əliyev - elm və təhsilin himayədarı" mövzusunda "Novruz mühazirəsi" dinlənilib. Mühazirədə ADPU-nun rəhbərliyi, prorektorlar, dekanlar, kafedra müdirləri, professor-müəllim heyəti və magistrantlar iştirak edib.

Açılış nitqi ilə çıxış edən universitetin sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev layihə haqqında məlumat verərək, bu ictimai mühazirələrin artıq 6 ildir Elm və Təhsil Nazirliyi tərəfindən təşkil olunduğunu və bu ilin ilk mühazirəsinin ADPU-da keçirildiyini, ardınca isə ADPU-da bu layihənin davamı kimi universitetin görkəmli alimlərinin elm, təhsil, mədəniyyət sahəsində mühazirələrinin təşkil olunması qərara alınıb.

Qeyd olunub ki, bir neçə mühazirə keçirilib və növbəti aktual mövzuya həsr olunan "Novruz mühazirəsi"ni professor Asəf Zamanovdan dinləyəcəyik.

Professor Asəf Zamanov vurğulayıb ki, 2023-cü ilin Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyinə təsadüf etməsi və ölkəmizdə "Heydər Əliyev İli" elan olunması onun böyük irsinin gənc nəslə çatdırılması baxımından da əlamətdardır. Bu aspektdən Ulu Öndərin elm və təhsil sahəsində gördüyü işlər, təşəbbüslər olduqca əhəmiyyətlidir. Heydər Əliyev hələ sovetlər dönəmindən gələcək müstəqil dövlətin bütün sahələrdə ehtiyacı olan kadr ehtiyatını formalaşdırmaq məqsədi ilə intellektual potensialın inkişafını diqqət mərkəzində saxlamış, sovet respublikalarında ali təhsil almağa göndərilən azərbaycanlıların sayını illik 1000 nəfərə çatdırmış, Elmlər Akademiyasının inkişafına xüsusi dəstək göstərərək fundamental elmlər, həmçinin kibernetika və kosmik tədqiqatlar kimi zəruri və yeni elm sahələrinin ölkəmizdə tərəqqisinə nail olmuşdur. Bu dövrdə 10 cildlik Azərbaycan Ensiklopediyasının hazırlanaraq yüksək tirajla nəşr olunması da ayrıca hadisə idi. Müstəqillik illərinin ilk vaxtlarından özəl ali təhsil müəssisələri şəbəkəsinin yaradılması və genişləndirilməsi, eyni zamanda keyfiyyətə nəzarət tədbirlərinin görülməsi, milli gənclər siyasətinin əsasının qoyulması, Azərbaycan dilinin qorunması və inkişafı, alimlərin, elm və mədəniyyət xadimlərinin yubileylərinin keçirilməsi, milli irsin öyrənilməsi və s. sahələrdəki tədbirlərin Heydər Əliyevin müstəsna fəaliyyət spektrini göstərdiyi qeyd olunub.

Ulu Öndər öz xatirələrində vurğulayırdı ki, ötən əsrin 80-ci illərinin sonunda SSRİ rəhbərliyindən istefa verərkən iş otağımdan sovetlər birliyinin aparıcı ali məktəblərinə təhsil almağa göndərdiyim tələbələrin siyahısını özümlə götürdüm. - Hansı ki, bu siyahıda gələcək müstəqil Azərbaycanın intellektual elitası əks olunurdu deyə prof. Asəf Zamanov vurğulayıb.

Bildirilib ki, digər sahələrdə olduğu kimi hərbi təhsilə də böyük önəm verən Ümummilli Liderin düşünülmüş qərarları nəticəsində müstəqil Azərbaycan ordusunun ilkin kadr potensialı formalaşırdı. Yekunda qeyd olunub ki, bütün bu sistemli və hərtərəfli fəaliyyət nəticəsində hazırda Azərbaycan informasiya cəmiyyəti şəraitində uğurla fəaliyyət göstərən, kosmik ölkələr qrupunun üzvü, beynəlxalq qurumlarda yüksək səviyyədə təmsil olunan söz sahibi dövlətdir.

Ulu Öndərin qoyduğu təməllər üzərində Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin rəhbərliyi ilə işğal altındakı torpaqlarımız azad edildi, "Böyük Qayıdış" proqramına start verildi. XX əsrin əvvəllərində Məhəmməd Hadi ürək ağrısı ilə "Yox millətimin imzası imzalar içində" deyirdisə, bu gün Azərbaycanın imzası dünya miqyasında mötəbər imzalar içində yer alır.

Daha sonra mühazirə ətrafında prof. Fərrux Rüstəmov və başqaları təəssüratlarını bölüşüb, müəllim və magistrantların suallarını cavablandırılıb.








# Ağcabədi filialında Heydər Əliyevin 100 illiyinə həsr olunan dəyirmi masa keçirildi



Martın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi filialında Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyi ilə əlaqədar dəyirmi masa keçirildi. Dəyirmi masada Azərbaycan Respublikası Milli Məclisinin Aqrar Siyasət Komitəsinin sədri, millət vəkili Tahir Rzayev, Yeni Azərbaycan Partiyası (YAP) Ağcabədi rayon təşkilatının sədri Rövşən Əhmədov, filialın professor-müəllim heyəti və yüksək nailiyyətli tələbələri iştirak edirdi.

Tədbiri giriş sözü ilə açan filialın direktoru dosent Mobil Məcidov qonaqları salamladı. Sonra unudulmaz lider Heydər Əliyevin və torpaqlarımızın bütövlüyü uğrunda canından keçmiş şəhidlərimizin müqəddəs ruhları bir dəqiqəlik sükutla yad edildi, Dövlət Himni səsləndirildi.

Direktor Ulu Öndər Heydər Əliyevin Azərbaycan xalqının milli müqəddəratının həlli istiqamətindəki misilsiz xidmətlərindən danışdı.

Millət vəkili Tahir Rzayev çıxış edərək, 2023-cü təqvim ilinin "Heydər Əliyev İli" kimi qəbul olunmasını Ulu Öndərə sədaqətin bariz nümunəsi kimi qeyd etdi. Bildirdi ki, siyasi fəaliyyəti boyunca Azərbaycan xalqına bağlı olan, onun müstəqilliyi, inkişafı və parlaq gələcəyi naminə durmadan çalışan, dövlətçilik ənənələrimizi azərbaycançılıq ideologiyasının prinsipləri ilə cilalayan Heydər Əliyev irsinin öyrədilməsinin əhəmiyyəti böyükdür.

Tahir Rzayev Heydər Əliyevin özündən sonra yerinə layiqli siyasi varis qoyub getməsini onun Azərbaycan xalqına son xidməti kimi vurğuladı.

Çıxış edən Rövşən Əhmədov Heydər Əliyevin siyasi hakimiyyəti illərində xalqa xidmətlərindən söz açaraq bildirdi ki, Heydər Əliyevin siyasi hakimiyyətə gəldiyi hər iki dövrdə Azərbaycanda vəziyyət olduqca acınacaqlı idi. İlk gəlişində ölkəni iqtisadi-mədəni gerilikdən xilas edən Ulu Öndərimiz, ikinci gəlişində xalqımızın xilaskarı missiyasını həyata keçirdi. Məruzəçi torpaqlarının 20 faizini itirən, minlərlə qaçqın-köçkünü olan bir ölkədə siyasi sabitliyə nail olan Heydər Əliyevin ölkənin iqtisadi inkişafına təkan verən bir sıra islahatlar həyata keçirməsindən də danışdı. Xüsusilə, hərbi sənayenin inkişafı, ordu quruculuğunun həyata keçirilməsi kimi məsələlərin yaxın tariximizdə - 44 günlük Vətən Müharibəsində bəhrə verməsini xüsusilə vurğuladı.

Filialın tərbiyə işləri üzrə direktor müavini dosent Mahir Səlimov Heydər Əliyevin siyasi fəlsəfəsindən bəhs edərkən, xüsusilə, onun idarəetmə mexanizmi, ölkəni ən kritik məqamlarda belə ağıl və təmkinlə idarə etməsini vurğuladı.

Heydər Əliyevin Azərbaycan elminin, təhsilinin inkişafındakı rolundan söz açan Pedaqogika, psixologiya və onların tədrisi texnologiyası kafedrasının müdiri, p.ü.f.d., baş müəllim Tahir Kərimli isə Ümummilli Liderin təhsilə aid məhşur kəlamlarından sitat gətirdi: "Təhsil millətin gələcəyidir. Məktəb, maarif, təhsil işi ilə həmişə sıx bağlı olmuşam... Hesab edirəm ki, cəmiyyət haradan olursa-olsun, nədən olursa-olsun, kəsib təhsilə xərcləməli, gənc nəslin təhsilinə, müəllimə kömək etməlidir. Bu, mənim prinsipal mövqeyimdir".

Heydər Əliyev fenomeninin Azərbaycan ədəbiyyatında poetik dillə ifadəsi barədə danışan filialın Keyfiyyətin təminatı şöbəsinin müdiri, baş müəllim Qərənfil Rzayeva dahi şəxsiyyətə həsr olunmuş "Heydər adlı günəş sönməz" şeiri ilə tədbir iştirakçılarına poetik anlar yaşatdı.

Sonda Ümummilli Lider Heydər Əliyevin şərəfli ömür yolu və siyasi fəaliyyətinə həsr olunmuş videolent təqdim olundu.

# Heydər Əliyevin AXC tarixinin tədqiqindəki rolu ilə bağlı elmi seminar keçirilib

Martın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının təşkilatçılığı ilə "Azərbaycan Xalq Cümhuriyyəti tarixinin tədqiqi və təbliğində Ümummilli Lider Heydər Əliyevin rolu" adlı elmi seminar keçrildi.

Kafedranın müdiri dosent Naibə Əhmədova seminarı giriş sözü ilə açaraq, Cümhuriyyətin yaranması və qısa müddətdə olsa da, fəaliyyətinin Azərbaycan xalqının dövlətçilik tarixində mühüm əhəmiyyəti olmasından bəhs etdi. Bildirdi ki, bugünkü elmi seminarda Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyi çərçivəsində Azərbaycan Xalq Cümhuriyyətinin tarixi ilə bağlı verdiyi qərarlar, sərəncamlar, nitqlər və çıxışlarına yenidən nəzər salınmış və onların araşdırılmasının vacibliyi gündəmə gətirilmişdir. Qeyd olunub ki, məhz bu sərəncamlardan sonra AXC irsi sistemli şəkildə araşdırılmağa başlanıldı.

AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunun Azərbaycan Xalq Cümhuriyyəti tarixi şöbəsinin böyük elmi işçisi Aygün Əzimova "Ümummilli Lider Heydər Əliyevin Azərbaycan Xalq Cümhuriyyəti tarixinə baxışı" adlı məruzəsində Cümhuriyyət tarixinə qısa nəzər yetirilərək, görülən əhəmiyyətli işlərdən, onun Azərbaycanın dövlətçilik tarixindəki rolundan, həmçinin Heydər Əliyevin çıxışlarında Cümhuriyyətin tarixi ilə bağlı səsləndirdiyi bəzi fikirlərindən danışdı.

Azərbaycan Turizm və Menecment Universitetinin (ATMU) İctimai fənlər kafedrasının dosenti İbrahim Əliyev "Müasir Azərbaycan dövlətçiliyi və Heydər Əliyev" adlı



məruzəsində Azərbaycanın çoxəsrlik dövlətçilik tarixindən bəhs edərək, 1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının bu tarixin parlaq səhifələrindən biri olduğunu vurğuladı.

Məruzəçi qeyd etdi ki, 1991-ci ilin sonlarında sovetlər ittifaqının dağılması ilə əlaqədar Azərbaycanın dövlət müstəqilliyinin elan edilməsi və 1993-cü ilin oktyabrın 3-də keçirilən ümumxalq referendumu ilə xalqın etimadını qazanan Ümummilli Lider Heydər Əliyev bu inamı doğruldaraq, Azərbaycanın iqtisadi dirçəlişi, beynəlxalq əlaqələrinin formalaşdırılması, ölkəmizin dünya birliyinə inteqrasiyası prosesində inamla irəliləməsini təmin etdi.

Tarix İnstitutunun Tarixin nəzəriyyəsi, mənbəşünaslıq və tarixşünaslıq şöbəsinin baş elmi işçisi tarix elmləri doktoru Vaqif Abışov "Zaqafqaziya Seymi və onun sənədləri" adlı məruzəsində Seymin sənədləri əsasında qeyd edib ki, 1918-ci il aprelin 22-də Zaqafqaziya müstəqilliyini elan etməsinə baxmayaraq, burada sabitliyi tənzimləmək mümkün olmamışdı. Erməni silahlı dəstələrinin türk-müsəlman əhalisinə qarşı törətdiyi soyqırımlar isə vəziyyəti daha da gərginləşdirmişdi. Məhz belə bir şəraitdə yaranan milli dövlət bu fəlakətlərin qarşısını aldı. Məruzələrdən sonra müzakirələr başlandı, məruzəçilər tələbələrin suallarını cavablandırdı.

## Quba filialında “Ulu öndər Heydər Əliyevin irsində multikultural və tolerant dəyərlər” mövzusunda elmi-praktik konfrans keçirilib



Martın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialı və Azərbaycan Respublikasının Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyinin Quba regional "ASAN xidmət" mərkəzinin birgə təşkilatçılığı ilə "Heydər Əliyev İli" çərçivəsində "Ulu öndər Heydər Əliyevin irsində multikultural və tolerant dəyərlər" mövzusunda elmi-praktik konfrans keçirilib. Tədbirdə ADPU-nun Quba filialının professor-müəllim heyəti, tələbələri, Quba regional "ASAN xidmət" mərkəzinin əməkdaşları və könüllüləri olmaqla ümumilikdə 200 nəfərə yaxın auditoriya iştirak edirdi.

İlk olaraq Azərbaycan Respublikasının Dövlət Himni səsləndirildi. Filialın akt zalında baş tutan tədbirdə Quba regional "ASAN xidmət" mərkəzinin könüllülərlə iş üzrə məsul şəxsi Ülvi Məmmədov qonaqları salamlayaraq "Heydər Əliyev İli"nə həsr olunmuş elmi-praktik konfransın əhəmiyyətini vurğuladı və konfransın gündəliyini iştirakçıların diqqətinə çatdırdı.

ADPU-nun Quba filialının direktoru dosent Yusif Alıyev tədbir iştirakçılarını salamlayaraq, müstəqil Azərbaycanın qurucusu, Ümummilli Lider Heydər Əliyevin bütün sahələrdə olduğu kimi, multikulturalizm sahəsində gördüyü mühüm işlərin də bu gün uğurla davam etdirilməsindən danışdı.

Məruzəçi Ülvi Məmmədov "Multikultural dəyərlərin formalaşmasında təhsilin rolu" mövzusunda çıxış edərək qeyd etdi ki, Heydər Əliyev etnik milliyyətçiliyə alternativ kimi bütövlükdə Azərbaycan xalqının və cəmiyyətinin, eyni zamanda Azərbaycan dövlətçiliyinin yüksəlişini şərtləndirən və multikulturalizmin əsas bazası olan azərbaycançılıq prinsipini milli ideologiya kimi irəli sürürdü.

Daha sonra ADPU-nun Quba filialının Tarix, pedaqogika və sosial elmlər kafedrasının müəllimi, əməkdar mədəniyyət işçisi Elza Orucova "Müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu", həmin kafedranın müəllimi Aygün Şıxbabayeva "Heydər Əliyev irsində multikultural və tolerant dəyərlər", Riyaziyyat və təbiət elmləri fakültəsinin əməkdaşı Nəhayət Şirinova "Heydər Əliyev Azərbaycan qadınları haqqında", Quba regional "ASAN xidmət" mərkəzinin "Hüquqşünaslıq" istiqaməti üzrə Master 2 könüllüsü Ayşə Səfərəliyeva "Müasir Azərbaycanda multikultural cəmiyyət", Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin Quba bölgəsi üzrə şöbəsinin baş məsləhətçisi Fərid Məmmədov isə "Azərbaycanda multikulturalizm və dini müxtəliflik" mövzusunda məruzə elədi.

## Heydər Əliyevə həsr olunmuş “Qurtuluş” tamaşası nümayiş olundu



Martın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Cəfər Cabbarlı adına İrəvan Dövlət Azərbaycan Dram Teatrının kollektivi tərəfindən teatrın direktoru, şair-dramaturq İvtixar Piriyevin “Qurtuluş” pyesinin tamaşası nümayiş etdirib.

Tədbirdə ADPU-nun rəhbərliyi, professor-müəllim və tələbə kollektivi ilə yanaşı Pedaqoji Universitetdə ekskursiyada olan İmişli, Beyləqan, Saatlı və Sabirabad məktəbliləri də iştirak edib.

Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyi və “Heydər Əliyev İli” münasibətilə icra olunan "Ulu öndər Heydər Əliyev irsini öyrənirik" layihəsi çərçivəsində nümayiş etdirilən tamaşa müstəqillik tariximizə, bu tarixin ən gərgin dövrlərinə, müasir Azərbaycanın ən parlaq səhifələrini yaradan görkəmli dövlət xadimi Heydər Əliyevin siyasi fəaliyyətinin fenomenal cəhətlərinə həsr olunub. Tamaşanın quruluşçu rejissor və tərtibatçı rəssamı İvtixar Piriyev, rejissor assistenti İmaməli İmaməliyevdir. Səhnə əsərində Heydər Əliyevin bədii obrazını da Əməkdar mədəniyyət işçisi İftixar Piriyev canlandırır. Digər rolları teatrın aktyorları Məhərrəm Musayev, Esmiralda Şahbazova, Niyaməddin Səfərəliyev, Əmrulla Nurullayev, Natiq Haziyev, Sevinc Hüseynova, Bəhruz Hikmətoğlu, Fərid Valiyev, Samir Əliyev, Müdvər Nemətova, Xədicə Məmmədova, Pərvin Dadaşova, Güney Əliyeva, Sevinc Hüseynova Bəxtiyar, Zaki Fətəliyev, Səbinə İmamverdiyeva, Anar Buludov, Arzuman Tanrıverdi ifa edirlər. Tamaşa universitet kollektivi, tələbələr və məktəblilər tərəfindən maraqla qarşılanıb.

## “Heydər Əliyev və azərbaycançılıq məfkurəsi”

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Heydər Əliyev Mərkəzində Nərimanov Rayon İcra Hakimiyyətinin (RİH) təşkilatçılığı ilə müasir Azərbaycan dövlətinin qurucusu, görkəmli dövlət xadimi, Ümummilli Lider Heydər Əliyevin 100 illiyinə həsr olunmuş "Heydər Əliyev və azərbaycançılıq məfkurəsi" mövzusunda konfrans keçirilib. Ziyalıların, elm xadimlərinin və gənclərin iştirak etdiyi konfransda çıxış edən Nərimanov RİH-in başçısı Elgin Həbibullayev Ulu Öndərin həyat və fəaliyyətindən, onun müstəqil Azərbaycan Respublikasının qurulması və möhkəmlənməsində, eyni zamanda azərbaycançılıq ideologiyasının formalaşmasındakı misilsiz xidmətlərindən danışıb. İcra başçısı Ümummilli Lider Heydər Əliyev tərəfindən bünövrəsi qoyulmuş strategiyanın hazırda uğurla davam etdirildiyini, ölkəmizin Prezident İlham Əliyevin rəhbərliyi ilə daha da inkişaf edərək, regionda vacib aktorlardan birinə çevrildiyini bildirib.



Tədbirdə ADPU-nun Heydər Əliyev Mərkəzinin müdiri Tahir Süleymanov, Nərimanov Rayon Ağsaqqallar Şurasının sədri, Vətən Müharibəsi Qəhrəmanı Azad Hümbətovun atası Arif Hümbətov, Odlar Yurdu Universitetinin prorektoru Qabil Qafarov, ADPU-nun dosenti Allahverdi Hacıyev və digərləri çıxış edərək, Ümummilli Lider Heydər Əliyevin Azərbaycanın çoxəsrlik dövlətçilik tarixində xüsusi yer tutmasından, ölkəmiz və xalqımız qarşısındakı müstəsna xidmətlərindən bəhs ediblər.

## 31 Mart soyqırımı barədə əsl həqiqətlər Ümummilli Lider Heydər Əliyevin sayəsində ictimaiyyətə çatdırılıb

Martın 31-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialı və Türk Ağsaqqalları İctimai Birliyinin (TAİB) birgə təşkilatçılığı ilə "Heydər Əliyev İli" çərçivəsində "31 Mart - Azərbaycanlıların Soyqırımına hüquqi, siyasi və tarixi qiymətin verilməsində Ulu Öndər Heydər Əliyevin rolu" mövzusunda elmi-praktik konfrans keçirilib. Konfrans iştirakçıları əvvəlcə Ulu Öndər Heydər Əliyevin abidəsini ziyarət edib, xatirəsini ehtiramla anıblar. Sonra Quba Soyqırımı Memorial Kompleksi və Quba Şəhidlər xiyabanı ziyarət olunub. ADPU-nun Quba filialında təşkil olunan konfransın iştirakçıları Ulu Öndər Heydər Əliyevin və şəhidlərimizin xatirəsini bir dəqiqəlik sükutla yad ediblər.



Filialın direktoru, fizika elmləri doktoru Yusif Alıyev bildirib ki, 1918-ci ilin mart hadisələri Bakı Soveti və erməni silahlı dəstələrinin azərbaycanlılara qarşı törətdikləri qırğın kimi tarixə düşüb. Soyqırımı hadisələri Bakı şəhərində və Bakı quberniyasının müxtəlif bölgələrində, eləcə də Şamaxı, Quba, Xaçmaz, Lənkəran, Hacıqabul, Salyan, Zəngəzur, Qarabağ, Naxçıvan və digər ərazilərdə baş verib.

1998-ci il martın 26-da Prezident Heydər Əliyevin imzaladığı "Azərbaycanlıların soyqırımı haqqında" Fərmanla 31 mart tarixi Azərbaycanlıların Soyqırımı Günü kimi qeyd olunur. Bu münasibətlə dünyanın müxtəlif ölkələrində tədbirlər, anım mərasimləri, konfranslar keçirilir. Azərbaycanlılara qarşı soyqırımı siyasətinin uzun tarixi olsa da, bu barədə əsl həqiqət Ümummilli Lider Heydər Əliyevin sayəsində ictimaiyyətə çatdırılıb.

Daha sonra konfransda TAİB-in sədri, akademik Sudeyf İmamverdiyev "Azərbaycanlıların 31 Mart soyqırımı başəriyyətə, insanlığa qarşı törədilən erməni vəhşiliyinin bariz təzahürüdür" mövzusunda məruzə ilə çıxış edib. Natiq Ulu Öndər Heydər Əliyevin Azərbaycan xalqı qarşısındakı xidmətlərindən və 31 Mart soyqırımına hüquqi, siyasi və tarixi qiymətin verilməsindəki rolundan danışıb. Konfransda tarix elmlər doktoru Güllü Yoloğlu, akademik Sabir Tağıyev, Əməkdar mədəniyyət işçisi, Azərbaycan Televiziya və Radio Akademiyasının rektoru Telli Pənahqızı, AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun əməkdaşı, filologiya elmlər doktoru Xuraman Hümbətova, telejurnalist Mübariz Süleymanlı, qazi Qədir Quliyev çıxış ediblər. Bildirilib ki, Azərbaycan tarixinə bir çox şanlı səhifələrlə yanaşı, faciələr və soyqırımları, müsibətlərlə dolu səhifələr də yazılıb. Bu dəhşətli hadisələrdən biri də 1918-ci ilin mart-aprel aylarında yaşanmışdır. Azərbaycan dövlət müstəqilliyini bərpa etdikdən sonra xalqımızın tarixi keçmişinin obyektiv mənzərəsini ortaya qoymaq imkanı yarandı. İndi uzun illər gizli saxlanılan, üzərinə qadağa qoyulmuş həqiqətlər bir-bir açılır.

Elmi-praktik konfransın sonunda TAİB-in sədri, akademik Südeyf İmamverdiyev ADPU-nun Quba filialının Elmi Şurasının qərarı ilə Türk dünyasında elm, təhsil və mədəniyyət sahəsində xidmətlərinə və Heydər Əliyev irsinin təbliği istiqamətində önəmli fəaliyyətinə görə fəxri diplomla təltif edilib. Həmçinin ADPU-nun Quba filialının direktoru Yusif Alıyev TAİB tərəfindən təhsilin inkişafında xidmətlərinə və "31 Mart - Azərbaycanlıların Soyqırımına hüquqi, siyasi və tarixi qiymətin verilməsində Ulu Öndər Heydər Əliyevin rolu" mövzusunda elmi-praktik konfransın yüksək səviyyədə təşkilinə görə təltif edilib. Ona Ramin Əhmədovun müəllifi olduğu "Heydər Əliyev və antiterror siyasəti" adlı kitab hədiyyə olunub.

## YAP Veteranlar Şurasının üzvləri ilə görüş



Aprelin 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Heydər Əliyev məktəbinin lektoriyasında "Heydər Əliyev İli" çərçivəsində Yeni Azərbaycan Partiyasının (YAP) Veteranlar Şurasının üzvlərinin gənclərlə görüşü keçirilib. YAP Səbail rayon təşkilatının sədri Muxtar Nağıyevin moderatorluğu ilə keçirilən görüşdən əvvəl Ulu Öndərin universitetin foyesindəki abidəsi önünə gül dəstələri qoyulub, Ümummilli Lider Heydər Əliyevin və şəhidlərimizin aziz xatirələri bir dəqiqəlik sükutla yad edilib. Görüş çərçivəsində gənclər əvvəlcə Vaqif Mustafayevin Heydər Əliyev haqqında çəkdiyi çoxsaylı sənədli filmlərdən biri olan "Əsl məhəbbət haqqında" filmini izləyiblər. Çıxış edən YAP İdarə Heyətinin üzvü, YAP Veteranlar Şurasının sədri Arif Rəhimzadə Ulu Öndər Heydər Əliyevin bir siyasi xadim və şəxsiyyət kimi fövqəladə xüsusiyyətləri haqqında söhbət açaraq, onun olduqca uzaqgörən bir siyasətçi və lider, vətənini və həmvətənlərini hər şeydən üstün tutan bir vətəndaş, olduqca diqqətcil və qayğıkeş bir insan kimi örnək olduğunu qeyd edib. Vurğulanıb ki, hələ sovetlər dönəmindən etibarən milli dövlətin təməllərinin inşası üçün vacib addımlar atan Heydər Əliyevin ardıcıl siyasəti sayəsində, bu gün Ulu Öndər yolunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən 44 günlük Vətən müharibəsi ilə işğal altındakı torpaqlarımız azad edildi, böyük bərpa-quruculuq işlərinə start verildi. Görkəmli kinorejissor və ssenarist, Xalq artisti Vaqif Mustafayev gənclərə Heydər Əliyev kimi dahi şəxsiyyətin həyatı haqqında çəkdiyi çoxsaylı filmlər haqqında məlumat verərək, bu məsuliyyətli missiyanı icra edərkən, Heydər Əliyev şəxsiyyətinin bir çox unikal cəhətləri ilə yaxından tanış olaraq, onda olan sonsuz inam, enerji, azmkarlıq və diqqətcilliyin şahidi olduğunu vurğulayıb. Daha sonra çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov da öz növbəsində Ümummilli Liderin milli təhsil quruculuğu və Azərbaycan məktəbinin inkişafı ilə bağlı gördüyü işlərdən söz açaraq, Heydər Əliyevin vaxtilə ifadə etdiyi "Gələcəyimiz bir çox cəhətdən gənclərimizə nəyi və necə öyrətməyimizdən asılıdır" fikirinin fikrinin XXI əsr müəllim hazırlığında əsas sual olduğunu diqqətə çatdırıb. Diskussiya ilə davam edən görüşdə qonaqlar gənclərin Heydər Əliyev şəxsiyyəti və irsi ilə bağlı onları suallarına ətraflı cavab veriblər.

## Pedaqoji Kollecin tələbələri Respublika ifa müsabiqəsinin qalibi oldu

Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi sistemində fəaliyyət göstərən peşə və orta ixtisas təhsili müəssisələrinin tələbələri arasında müstəqil Azərbaycan dövlətinin qurucusu, Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyinə həsr olunmuş "Sən elə bir zirvəsən" adlı Respublika ifa müsabiqəsi keçirilib. Müsabiqədə Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin tələbələri də fəal iştirak edərək, qalib olublar. Belə ki, rəqs müsabiqəsində kollecin rəqs dərnəyinin üzvləri, şeir müsabiqəsində isə kollecin tələbəsi Aytac Süleymanova I yer tutublar. Kollecin digər tələbəsi Zəhra Kərimli isə mahnı müsabiqəsində III yer qazanıb.




## Təhsildə strateji idarəetmə və müasir yanaşmalar

Aprelin 6-da ADPU-da "Təhsildə strateji idarəetmə və müasir yanaşmalar" Magistrantların VI Respublika elmi konfransı öz işinə başlayıb. Əvvəlcə Təşkilat Komitəsinin üzvləri universitetin foyesində Ümummilli Lider Heydər Əliyevin abidəsi önünə gül dəstələri qoyublar. Sonra konfrans iştirakçıları ADPU-nun dövri-elmi nəşrləri, son 6 ildə universitetdə müntəzəm keçirilən magistrantların respublika elmi konfranslarının materialları və 2021-ci ildən ADPU-da nəşr olunan "Magistrant" dövri-elmi jurnalının nömrələrindən ibarət sərgi ilə tanış olublar.



Açılış nitqi ilə çıxış edən konfransın Təşkilat Komitəsinin sədri, ADPU-nun rektoru professor Cəfər Cəfərov iştirakçıları salamlayaraq qeyd edib ki, bu il Pedaqoji Universitetdə altıncı dəfə keçirilən Magistrantların Respublika elmi konfransı Azərbaycan xalqının Ümummilli Lideri, dahi rəhbər Heydər Əliyevin anadan olmasının 100 illiyinə həsr olunub. Rektor diqqətə çatıdırıb ki, Azərbaycan dövlət müstəqilliyini bərpa etdikdən sonra "Təhsil millətin gələcəyi, müstəqil dövlətin təməlidir" deyən müasir Azərbaycanın qurucusu, Ümummilli Liderimiz Heydər Əliyevin rəhbərliyi ilə təhsil sahəsinin qanunvericilik bazası təkmilləşdirilmiş, maddi-texniki baza gücləndirilmiş, təhsilin keyfiyyəti yüksəlmişdir və bu qayğı Ulu Öndərin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən bu gün də davam etdirilir. Prof. C.Cəfərov bildirib ki, ADPU-da son illərdə həyata keçirilən islahatlar universitetin yeni inkişaf mərhələsinə daxil olmasına şərait yaradıb. "Son dövrlərdə universitetdə ali təhsilin bütün sahələri üzrə kadr hazırlığında əsaslı irəliləyiş müşahidə olunur, beynəlxalq təcrübə öyrənilir, dövrün tələblərinə uyğun olaraq yeni ixtisaslar yaradılır." - deyə rektor qeyd edib. Vurğulanıb ki, ADPU-da MBA proqramı üzrə "Təhsilin təşkili və idarə olunması" və "Təlim və tədrisin təşkili və metodikası (SABAH)" magistratura ixtisaslaşmaları üzrə bu il ilk buraxılışlar olacaq, "Menecment (təhsilin təşkili və idarə olunması)" ixtisaslaşması üzrə ABŞ-nin Corc Vaşinqton Universiteti ilə həyata keçirilən ikili diplom proqramının isə ötən il ilk buraxılışı olub.

Rektor diqqətə çatdırıb ki, cəmiyyət həyatının bütün sahələrində, o cümlədən təhsildə sürətli dəyişikliklərin baş verdiyi dövrümüzdə təhsilin təşkili və idarə edilməsinə də münasibət dəyişilməli, yeni yanaşmalar tətbiq olunmalıdır. Bu istiqamətdə davamlı işlər aparılır və Respublika konfransının da bu mühüm problemə həsr olunması bu məqsədə xidmət edir.

Sonra ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov "Heydər Əliyev - elm və təhsilin himayədarı" mövzusunda məruzə ilə çıxış edib.

Çıxışçılardan professor Əli Zalov və professor İsa İsmayılov ADPU-da elmin populyarlaşdırılması və Ümummilli Lider Heydər Əliyev irsinin təbliği istiqamətində görülən işlərdən danışaraq, əməkdaşların son illərdə yüzlərlə kitab və 1000-dən çox elmi məqalələrinin nəşr olunduğunu, beynəlxalq tədqiqat, kadr və informasiya mübadiləsi işində aktiv iştirak etdiklərini diqqətə çatdırıblar. Daha sonra ADPU-nun magistrantı Nurxan Rəcəbli "Ali təhsil müəssisələrinin strateji planlaşdırılması və idarə edilməsi", BDU-nun magistrantı Ayan Mirzəyeva isə "Müasir dövrdə təhsil sistemində innovativ dəyişikliklər" mövzusunda məruzə ediblər.

Plenar iclasdan sonra Təhsildə strateji idarəetmə, İnnovasiyalar və təhsilin keyfiyyəti, Təhsildə sosial-psixoloji xidmət və Tədrisin müasir problemləri bölmələri üzrə məruzələrin dinlənilməsinə başlanılıb. Qeyd edək ki, 2 gün davam edən konfransda ADPU ilə yanaşı, 6 ali təhsil ocağının magistrantları, eləcə də Hökumətlərarası Təqaüd Proqramı çərçivəsində Pedaqoji Universitetdə təhsil alan çinli magistrantların 310-a yaxın tezisi dinlənilib.

## 100 illiyə həsr olunmuş kitab sərgisi

Aprelin 18-də Universitetin Kitabxana-İnformasiya Mərkəzində Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunmuş kitab sərgisi keçirilib.

Sərgidə universitet rəhbərliyi və professor-müəllim heyəti və tələbələrlə yanaşı, Erasmus+ KA1 müdbadilə proqramı çərçivəsində ADPU-da səfərdə olan Danimarkanın Kopenhagen Universitet Kollecinin (UCC) müəllimləri Lise Halkier və Lotte Klint, habelə Pedaqoji Universitetin Kitabxana-İnformasiya Mərkəzində praktika keçən Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin nəzdində Humanitar Kollecin tələbələri də iştirak edib. Sərginin açılışında çıxış edən rektor professor Cəfər Cəfərov Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyi və "Heydər Əliyev İli" münasibəti ilə ADPU-da silsilə tədbirlərin təşkil edildiyini diqqətə çatdırıb. Rektor bildirib ki, universitetdə mütəmadi olaraq Ümummilli Liderin xatirəsinə həsr olunmuş elmi konfranslar, gənc alim və tədqiqatçılar arasında müsabiqə, Heydər Əliyev dərsləri, ekskursiyalar, tələbə və magistrantlar arasında maarifləndirici, ədəbi-bədii tədbirlər, seminarlar və s. keçirilir.






Çıxış edən ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov diqqətə çatdırıb ki, ADPU-nun Kitabxana-İnformasiya Mərkəzinin fondunda Ulu Öndər Heydər Əliyevin əsərləri və onun haqqında müxtəlif dillərdə çoxsaylı ədəbiyyatlar yer alır. Prorektor diqqətə çatdırıb ki, Pedaqoji Universitetin Kitabxana-İnformasiya Mərkəzində Heydər Əliyevə aid ümumilikdə 344 adda 1572 nüsxə kitab mövcuddur ki, onlardan da 153 adda 1202 nüsxə ədəbiyyat Ümummilli Liderin əsərləri, 191 adda 370 nüsxə ədəbiyyat isə Ümummilli Lider haqqında yazılmış kiablardır. Bildirilib ki, kitabxanada Heydər Əliyevlə bağlı Azərbaycan dili ilə yanaşı (latın və kiril əlifası ilə), rus, türk, ingilis, fransız, ərəb, fars və serb dillərində olan ədəbiyyatlar var.

## Akademik Zərifə Əliyevanın 100 illiyi münasibəti ilə ADPU-da tədbir keçirilib



Aprelin 19-da ADPU-da Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının "Ü.Hacıbəyli - 68" Ərazi Partiya Təşkilatı (ƏPT) tərəfindən görkəmli oftolmoloq alim və ictimai xadim akademik Zərifə Əliyevanın 100 illik yubileyinə həsr olunmuş tədbir keçirilib. Tədbirdə universitetin rəhbərliyi, professor-müəllim kollektivi və fəal tələbələri ilə yanaşı tanınmış elmi-ictimai xadimlər iştirak ediblər. Əvvəlcə Ulu Öndər Heydər Əliyevin ADPU-nun foyesindəki abidəsi önünə gül dəstələri qoyulub.

Tədbirdə çıxış edən Pedaqoji Universitetin rektoru professor Cəfər Cəfərov bildirib ki, 2023-cü ilin aprel ayının 15-də Azərbaycanın görkəmli alimi, Əməkdar elm xadimi, tibb elmləri doktoru, professor, Azərbaycan Elmlər Akademiyasının həqiqi üzvü Zərifə Əziz qızı Əliyevanın anadan olmasının 100 ili tamam olur.

Rektor deyib: "Akademik Zərifə Əliyeva zəngin mənəviyyata sahib əsl ziyalı kimi mənalı ömür yolu keçmiş, əhatəli elmi fəaliyyəti ilə ölkəmizdə tibb sahəsinin inkişafına əhəmiyyətli töhfələr vermişdir. Azərbaycanda oftalmologiya məktəbinin ilk tədqiqat mərkəzi olaraq ixtisaslaşdırılmış elmi tədqiqat laboratoriyası məhz akademik Zərifə Əliyevanın təşəbbüsü ilə yaradılmışdır." Bildirilib ki, 3 noyabr 2022-ci il tarixində Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən "Akademik Zərifə Əliyevanın 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncam imzalanmışdır. Sonra akademikin həyat yolundan bəhs edən videoçarx nümyiş olunub. Tədbirdə çıxış edənlərdən vaxtilə Zərifə xanımla birgə çalışmış tanınmış oftolmoloq alim, professor Paşa Qəlbinur, tibb elmləri doktoru, Azərbaycan Fitoterapeftlər İctimai Birliyinin sədri Məlahət Qəhrəmanova, AMEA-nın vitse-prezidenti professor İradə Hüseynova və tibb tarixi üzrə araşdırmaçı Aidə Bəndəliyeva böyük alim və ictimai xadim, nəcib insani keyfiyyətlərə malik görkəmli şəxsiyyət kimi Zərifə xanım haqqında xatirələrini bölüşüb, onun elmi-praktik irsindən söz açaraq, apardığı tədqiqatların önəmi qeyd ediblər. Çıxışlarda vurğulanıb ki, Zərifə xanım böyük alim olmaqla yanaşı, görkəmli ictimai xadim kimi də Azərbaycan tarixində xüsusi yer tutur. Həm də Ulu Öndər Heydər Əliyevin ömür-gün yoldaşı kimi Zərifə xanım daim onun yanında olmuş, bu gün Ümummilli Lider yolunu uğurla davam etdirən möhtərəm Prezident İlham Əliyev kimi məharətli və güclü siyasi lider yetişdirmişdir. Tədbir Filologiya fakültəsinin tələbəsi Aytac Muradlının ifasında Mahirə Nağıqızının "Heydər dastanı" şeirinin səsləndilməsi ilə sona çatıb.

## Heydər Əliyevin 100 illiyi münasibətilə ağacəkmə kampaniyası



Aprelin 20-də ADPU-da ikinci tədris binasının həyətyanı sahəsində Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyi münasibətilə ağacəkmə aksiyası təşkil olunub. Aksiyada Universitetin və Tarix və coğrafiya fakültəsinin rəhbərliyi, universitetin kafedra və mərkəz müdirləri, müəllim və tələbələr iştirak ediblər. Aksiya zamanı həmişəyaşıl ağaclar əkilib və ağaclara ilkin qulluq göstərilib. Aksiyada çıxış edən Pedaqoji Universitetin rektoru professor Cəfər Cəfərov Ulu Öndər Heydər Əliyevin zəngin irsindən söz açaraq, dahi şəxsiyyətin xatirəsinin hər bir Azərbaycan vətəndaşının qəlbində əbədi yaşadığını vurğulayıb. Rektor Ümummilli Lider Heydər Əliyevin müstəqil dövlət quruculuğu sahəsindəki hərtərəfli titanik fəaliyyətindən danışarkən, bu böyük insanın gərgin ictimai-siyasi vəziyyətdə Azərbaycanda hüquqi vətəndaş cəmiyyəti, milli iqtisadiyyat, təhsil və elm, mədəniyyət sahələri ilə yanaşı, ekoloji tarazlığın qorunması və təbiətin mühafizə olunması, yaşıllaşdırma fəaliyyəti və ekoloji təfəkkürün inkişafı ilə bağlı gördüyü müstəsna xidmətləri qeyd edib, bugünkü aksiyanın Ulu Öndərin ruhuna ehtiram əlaməti olaraq təşkil olunduğunu bildirib.

## ADPU komandası universitetlərarası voleybol yarışında II yer tutub

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) SABAH qruplarının "Nika" komandası SABAH qrupları tələbələrinin idman yarışları çərçivəsində Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyinə həsr olunmuş voleybol yarışında II yer tutub. Qeyd edək ki, turnirdə ümumilikdə 9 universitetdən 11 komanda qalibiyyət uğrunda mübarizə aparıb.




## SABAH tələbələri idman yarışlarında qalib oldu



ADPU-nun SABAH qruplarının komandaları 10 universitetin SABAH qrupları tələbələrindən ibarət komandaların qatıldığı Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunan "SABAH qrupları tələbələrinin idman yarışları"nda "Atıcılıq" nominasiyası üzrə III, qızlar arasında voleybol yarışlarında isə II yerə çıxmışlar. Eyni zamanda ADPU SABAH qruplarının tələbəsi İlahə Nəbiyeva yarışın voleybol üzrə ən yaxşı oyunçusu adına layiq görülmüşdür.

## "Gələcəyin müəllimi" II musiqi müsabiqəsi



Aprelin 20-də Beynəlxalq Muğam Mərkəzində Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) və Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin (ADMİU) birgə layihəsi olan "Gələcəyin müəllimi" II musiqi müsabiqəsinin açılış konserti keçirilib. Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyinə həsr olunmuş müsabiqənin açılış konsertində hər iki ali məktəbin rəhbərliyi, professor-müəllim heyəti, tələbələr, musiqisevərlər və media nümayəndələri iştirak ediblər.

ADMİU-nun "Xəzər" tələbə xor kollektivinin ifasında Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Mərasimi giriş sözü ilə ADPU-nun rektoru professor Cəfər Cəfərov və ADMİU-nun rektoru professor Ceyran Mahmudova açıblar. Ceyran Mahmudova müsabiqə iştirakçılarını əlamətdar hadisə münasibəti ilə təbrik edib, həm ADMİU-nun, həm də ADPU-nun tələbələrinə təhsildə və gələcək fəaliyyətlərində uğurlar arzulayıb. O bildirib ki, Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100-cü ildönümünə həsr olunmuş "Gələcəyin müəllimi" II Musiqi Müsabiqəsi analoqu olmayan bir müsabiqədir. 2019-cu ildə birinci keçirilən müsabiqə ölkədə böyük marağa səbəb oldu, layiqli musiqi müəllimlərinin özlərini tanıtmasına kömək etməklə bərabər, fəaliyyətləri üçün də böyük stimul rolunu oynadı.

Daha sonra konsert proqramı başlayıb. May ayının 1-də isə Pedaqoji Universitetin böyük zalında müsabiqənin qala konserti keçirilib. ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov və ADMİU-nun elm və yaradıcılıq işləri üzrə prorektoru dosent Sədaqət Əliyeva açılış nitqi ilə çıxış edərək, iki ali təhsil ocağının birgə layihəsi əsasında artıq ikincisi keçirilən bu unikal müsabiqənin gələcəyin musiqi müəllimlərinin stimullaşdırılması və onların peşəkar inkişafına dəstək baxımından olduqca əhəmiyyətli olduğunu diqqətə çatdırıblar.

Sonra isə qaliblərin təltif olunması mərasimi keçirilib. Əvvəlcə müsabiqədə iştirak edən ADPU və ADMİU tələbələrinə diplom və sertifikatlar təqdim olunub. Daha sonra qaliblərin mükafatlandırılmasına başlanılıb. Müsabiqənin yekun nəticəsinə əsasən, "Duet və ya ansambl" nominasiyası üzrə "Gələcəyin müəllimi" II musiqi müsabiqəsinin Qran-pri mükafatını ADMİU-nun tələbəsi, fleyta ifaçısı Rəhilə Nəzərova qazanıb. "Duet və ya ansambl" nominasiyası üzrə Aynur Bəhmənli (ADMİU) I yerə, Köçəri Məstəliyev və Aygün Vəliyeva (ADPU) II yerə, Zeynəb Zeynalova və Aygün Vəliyeva (ADPU) III yer tutublar, Şəms Əzizova və Nurlan Həsənov (ADPU) nominasiya üzrə xüsusi diploma, Sədəfxanım Mehdiyeva və Nigar Quluzadə isədiplomla təltif olunublar. "Müəllim - tələbə dueti" nominasiyası üzrə Aynur Bəhmənli (ADMİU) II yerə, Camilə İsmayılova (ADPU) isə III yerə layiq görülüb. "Solo alətlər" nominasiyası üzrə isə Çinarə Quliyeva (fortepiano, ADPU), Gülsurə İbişzadə (fortepiano, ADMİU), Ayxan Səmədov (saz aləti, ADMİU), Zeynəb Zeynalova və Köçəri Məstəliyev (tar aləti, ADPU) və Gülşən Hüseynova (solo-xanəndə, ADMİU) I yerə, Nuray Əkbər (fortepiano, ADPU), Sevinc Tağıyeva (fortepiano, ADMİU), Murad Bayramlı (tar aləti, ADMİU), Nuray Əkbər (solo-vokal, ADPU) və Əsmər Əlizadə (solo-xanəndə, ADMİU) II yerə, Günay Quliyeva (fortepiano, ADMİU), Günel Hüseynova (fortepiano, ADPU) və Arif Səmədzadə (digər alətlər, ADPU) isə III yerə layiq görülüblər. Mükafatlandırma mərasimindən sonra qaliblərin qala konserti keçirilib.

## Pedaqoji Universitet Heydər Əliyevin 100 illiyini qeyd etdi: "Əsrə bərabər ömür"

Mayın 8-də ADPU-nun Heydər Əliyev Mərkəzində Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyinə həsr olunmuş "Əsrə bərabər ömür" adlı konfrans keçirilib. Tədbirdən əvvəl universitetin əməkdaş və tələbələri Fəxri Xiyabanda Ulu Öndərin və görkəmli oftalmoloq alim Zərifə xanım Əliyevanın məzarlarını ziyarət edib, dahi şəxsiyyətin xatirəsinə ehtiramlarını ifadə ediblər.



ADPU-nun Heydər Əliyev Mərkəzinin müdiri Tahir Süleymanovun moderatorluğu ilə keçirilən konfransda əvvəlcə Heydər Əliyevin və Azərbaycanın ərazi bütövlüyü uğrunda canlarından keçmiş şəhidlərin xatirələri bir dəqiqəlik sükutla yad edilib. Konfransda giriş nitqi ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, fenomenal şəxsiyyət olan Heydər Əliyev xalqımızın öz çoxəsrlik tarixində yetirdiyi ən parlaq simalardan biridir. Dərin savadı, geniş dünyagörüşü, qeyri-adi hafizəsi, analitik təfəkkürü, mükəmməl natiqlik qabiliyyəti və təşkilatçılıq bacarığı sayəsində Ulu Öndər dünyanın ən tanınmış dövlət başçıları ilə bir səviyyəyə yüksələ bilmişdi. ABŞ-ın sabiq Prezidenti Corc Buş onu "Cənubi Qafqazda ən əsas şəxsiyyət", Rusiya Prezidenti Vladimir Putin "siyasət nəhəngi", dəfələrlə Türkiyənin Baş naziri olmuş Bülent Ecevit "min ildə bir dəfə yetişən dahi" adlandırırdı. Heydər Əliyev elə nadir liderlərdəndir ki, öz ölkəsinə iki dəfə, bir-birindən köklü şəkildə fərqlənən iki sosial-iqtisadi və siyasi sistem şəraitində uğurla rəhbərlik edə bilmişdir. Heydər Əliyev istər Azərbaycanın rəhbəri olduğu, istərsə də Sovet İttifaqının ali rəhbərliyində təmsil olunduğu illərdə ölkəmiz və xalqımız qarşısında elə müstəsna xidmətlər göstərmişdir ki, 1969-2003-cü illər arasındakı 34 illik böyük bir dövr haqlı olaraq "Azərbaycan tarixinin Heydər Əliyev mərhələsi" adlandırılır. Təsadüfi deyil ki, 2003-cü ilin oktyabrında keçirilən prezident seçkilərində seçicilərin dörddə üçündən çoxu məhz Heydər Əliyevin müəyyənləşdirdiyi siyasi kursun davamçısına səs verdi. Son 20 ildə ölkəmiz Ulu Öndərin formalaşdırdığı möhkəm təməl üzərində, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin rəhbərliyi altında uğurla inkişaf etməkdədir. Daha sonra professor Xaqani Məmmədov "Azərbaycan tarixinin Heydər Əliyev dövrü", Azərbaycan tarixi kafedrasının baş müəllimi Cəfər Xanəliyev "Heydər Əliyevin rəhbərliyi illərində Azərbaycanda təhsilin inkişafı", ADPU-nun Tələbə Gənclər Təşkilatının sədri Təhmasib İmaməliyev "Heydər Əliyev və Azərbaycanda gənclər siyasəti" mövzularında məruzələrlə çıxış ediblər. Bədii hissədə Heydər Əliyevə həsr olunmuş sənədli filmin nümayişindən sonra Filologiya fakültəsinin tələbəsi Könül Babayeva Xalq şairi Zəlimxan Yaqubun "İmzalı, möhürlü həqiqətimsən" şeirini səsləndirib. Konfrans İncəsənət və fiziki tərbiyə fakültəsinin tələbə xorunun ifasında "Ulu Öndər" və "Ali Baş Komandan" mahnıları ilə yekunlaşıb.

## Heydər Əliyev və Azərbaycanda milli intibah dövrü – Şamaxıda konfrans keçirilib






Aprelin 25-də Şamaxı Rayon İcra Hakimiyyəti və ADPU-nun Şamaxı filialının birgə təşkilatçılığı ilə Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyinə həsr olunmuş "Heydər Əliyev və Azərbaycanda milli intibah dövrü" mövzusunda konfrans keçirilib. Tədbirdən öncə Ümummilli Lider Heydər Əliyevin rayonun mərkəzində ucaldılan abidəsini ziyarət edildi, önünə gül dəstələri düzüldü, xatirəsi ehtiramla yad edildi. Daha sonra tədbir Şamaxı Rayon Mədəniyyət Mərkəzində davam etdirildi.

Tədbiri salamlama nitqi ilə Şamaxı Rayon İcra Hakimiyyətinin başçısı Tahir Məmmədov açdı. O, qeyd etdi ki, Azərbaycanın çağdaş tarixinin milli intibah dövrü Ümummilli Lider Heydər Əliyevin adı ilə bağlıdır. Daha sonra çıxış edən ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov Ulu Öndər Heydər Əliyevin Respublikaya rəhbərlik etdiyi dövrdə milli intibahın təminatında başlıca vasitə sayılan, cəmiyyətdə bir çox problemlərin həllində mühüm rol oynayan elm və təhsil sahəsindəki islahatlardan ətraflı bəhs etdi. Pedaqoji Universitetin beynəlxalq əlaqələr üzrə prorektoru professor Mahirə Hüseynova qeyd etdi ki, Heydər Əliyev Azərbaycan mədəniyyətinin inkişafında yeni bir dövrün əsasını qoydu. Mədəniyyətimiz, milli-mənəvi dəyərlərimiz beynəlxalq aləmdə tanındı. Etiraf olunmalıdır ki, Azərbaycanın görkəmli elm və mədəniyyət xadimləri Heydər Əliyev dövründə olduğu qədər heç zaman tanınmamışdır.

ADPU-nun Şamaxı filialının direktoru dosent Tünzalə Yusifova çıxışında qeyd etdi ki, bugünkü möhtəşəm Azərbaycanımızın danılmaz tərəqqisinin banisi, hamımız üçün doğma və unudulmaz olan Ümummilli Liderdir. Bu gün əminliklə deyə bilərik ki, Heydər Əliyevin ideyaları cənab prezidentimiz İlham Əliyevin siyasətində yaşayır və zəfər çalır. Sonra tədbir bədii hissə ilə davam etdirildi. Azərbaycan Respublikasının Xalq artistləri Ağadadaş Ağayev, Nurəddin Mehdixanlı, Mələykə Əsədova və Azərbaycan Respublikasının Əməkdar artisti Elnur Zeynalovun ifasında Ulu Öndərə həsr olunmuş şeir və mahnılar tədbirə rəng qatdı.

## Ulu Öndərin 100 illiyinə həsr olunmuş konsert proqramı

Mayın 2-də ADPU-da İncəsənət və fiziki tərbiyə fakültəsində Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyinə həsr olunmuş tədbir keçirilib. Tədbirdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, prorektorlar, fakültə dekanları, müvafiq struktur rəhbərləri, tələbə və müəllimlər iştirak ediblər. Tədbir iştirakçıları əvvəlcə, fakültənin foyesində "təsviri incəsənət müəllimliyi" ixtisasının müəllim və tələbələrinin rəsm əsərlərindən ibarət sərgi ilə tanış olub, "fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı müəllimliyi" ixtisasının tələbələri arasında şahmat və dama yarışını izləyiblər.



Daha sonra fakültənin akt zalında "musiqi müəllimliyi" ixtisasının müəllim və tələbələrinin ifasında konsert proqramına start verilib. Konsert proqramından öncə Ulu Öndər Heydər Əliyevin və vətənimizin azadlığı uğrunda canlarından keçmiş şəhidlərimizin aziz xatirələri bir dəqiqəlik sükutla yad edilib, Ümummilli Liderin fəaliyyətinə həsr olunmuş videoçarx nümayiş olunub. Daha sonra müəllim və tələbələrin ifasında konsert proqramı təqdim olunub.

## Praktik psixologiyaya dair regional elmi-praktik seminar

Mayın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil fakültəsinin nəzdində fəaliyyət göstərən Psixologiya Klubunun təşkilatçılığı ilə universitetin Quba və Şamaxı filialları, eləcə də, Bakı Slavyan Universiteti (BSU) və Bakı Dövlət



Universitetinin (BDU) psixoloq-müəllim və tələbələrinin iştirakı ilə görkəmli dövlət xadimi Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunmuş "Praktik psixologiya" mövzusunda regional elmi-praktik seminar keçirilib. Seminarın məqsədi tələbələrin peşəkarlıq səviyyəsinin artırılması, iştirakçılar arasında aparıcı təcrübə mübadiləsi, dünyagörüşünün genişləndirilməsi, müasir praktik psixologiya sahəsində psixoterapevtik metodika və texnologiyalar üzrə praktik biliklərin istifadəsi haqqında məruzələr və birgə müzakirələr etməkdir. Seminarın regional və universitetlərarası formatda keçirilməsinin məqsədi həm regionlarda yerləşən filiallarda təhsil alan gələcək psixologiya mütəxəssislərini bu mövzuda maarifləndirmək, həm də universitetlər arasında psixoloqların praktiki iş təcrübəsi mübadiləsinin təminidir.

Tədbirdə ADPU-nun Məktəbəqədər təhsil fakültəsinin dekanı dos. Nailə Hüseynova, Ümumi psixologiya kafedrasının müdiri, prof. Ramiz Əliyev, kafedranın professoru, Psixologiya Klubunun rəhbəri Elmar Hüseynov və BSU-nun dosenti Gülnara Həsənova çıxış ediblər.

Daha sonra müxtəlif ali məktəblərin tələbələrinin psixologiyanın aktual praktik sahələrinə aid ondan çox məruzəsi dinlənilib və müzakirələr aparılıb. Sonda iştirakçılar sertifikatlarla təltif olunub.

## "Heydər Əliyev və Azərbaycan dilinin inkişaf konsepsiyası" əsəri təqdim olundu




Mayın 10-da Filologiya fakültəsində ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru professor Mahirə Hüseynova və professor Sayalı Sadıqovanın Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illik yubileyi münasibətilə işıq üzü görən "Heydər Əliyev və Azərbaycan dilinin inkişaf konsepsiyası" adlı kitabının təqdimat mərasimi keçirilib. Tədbirdə ADPU rəhbərliyi, AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun Terminologiya şöbəsinin müdiri professor Sayalı Sadıqova, millət vəkili Şahin İsmayılov, professor Sevinc Əliyeva, "Azərbaycan müəllimi" qəzetinin baş redaktoru Sarvan İbrahimov, universitetin professor-müəllim heyəti və tələbələr iştirak ediblər. Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru professor Cəfər Cəfərov "Heydər Əliyev İli" çərçivəsində universitet əməkdaşlarının həyata keçirdikləri tədbirləri Ulu Öndərə sayğı kimi qiymətləndirmiş, nəşr olunan hər bir elmi əsərin gələcək nəsillərə layiqli töhfə olacağını bildirmişdir. Təqdimat mərasimində Azərbaycan Respublikası Dövlət Dil Komissiyası yanında Monitorinq Mərkəzinin direktoru professor Sevinc Əliyeva, ADPU-nun Müasir Azərbaycan dili kafedrasının müdiri dosent Könül Səmədova, Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrasının dosenti Həmzə Əliyev məruzə ilə çıxış etmişlər. Tədbir Mahirə Nağıqızının sözlərinə bəstələnmiş "Ata-Heydər, oğul-İlham" mahnısının sədaları altında tamamlanıb. Tədbirin sonunda iştirakçılara "Heydər Əliyev və Azərbaycan dilinin inkişaf konsepsiyası" kitabı, Ulu Öndərin 100 illik yubileyinə həsr olunmuş "Linqvistika problemləri" jurnalı və "Filologiya" qəzetinin xüsusi buraxılışı hədiyyə edilmişdir.

## Müəllim hazırlığının flaqmanı ADPU "Təhsil Festivalı"nda geniş stendlə təmsil olunub



ADPU Astarada Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyi münasibətilə təşkil olunan təhsil festivalında geniş stendlə iştirak edib. Tədbir Elm və Təhsil Nazirliyinin Lənkəran-Astara Regional Təhsil İdarəsi, Astara Rayon İcra Hakimiyyəti, Lənkəran Rayon Mədəniyyət İdarəsi, Lənkəran Dövlət Peşə Təhsil Mərkəzi tərəfindən Astara rayonunun dənizkənarı park-bulvar kompleksində təşkil olunub. Tədbirin açılış mərasimində elm və təhsil naziri Emin Əmrullayev, Milli Məclisin deputatları, ziyalılar və rayon ictimaiyyətinin nümayəndələri iştirak ediblər. Əvvəlcə, Ümummilli Lider Heydər Əliyevin rayonun mərkəzində ucaldılan abidəsi ziyarət olunub. Festivalın keçirilməsində məqsəd özəl sektor və ölkə üzrə təhsilin inkişafı üçün digər maraqlı tərəflər arasında regionda əməkdaşlıq platformasının yaradılmasına dəstək verməkdir. Festivalda müəssisələr xidmət və məhsullarından ibarət stendlər nümayiş etdirir, universitetlər, ümumi təhsil müəssisələri, peşə məktəbləri, bağçalar və məktəblərlə bağlı müxtəlif layihələr təqdim edirlər. Tədbir çərçivəsində tədris ilində xüsusi nailiyyətləri ilə fərqlənən şagirdlər, Vətən müharibəsi iştirakçıları olan təhsil işçiləri ilə görüşlər təşkil edilib. Festivalda iştirak edən aparıcı ali təhsil müəssisələri arasında Azərbaycan Dövlət Pedaqoji Universiteti özünün geniş stendi və təqdim olunan təhsil xidmətləri ilə xüsusilə fərqlənib. Universitetin stendi ilə tanış olan elm və təhsil naziri Emin Əmrullayevə son illər dövlətin yaxından dəstəyi ilə ADPU-da istər innovativ elmi-pedaqoji yanaşmaların tətbiqi, beynəlxalq əməkdaşlıq, istərsə də müasir tədris infrastrukturunun, laboratoriyaların yaradılması fonunda universitetdə qəbul planının tam dolduğu haqqında məlumat verilərək, keçirilən festivalda da cəmiyyətdə pedaqoji ixtisaslara və ADPU-ya böyük marağın təzahürünün əks olunduğu diqqətə çatdırılıb. Ziyarətçilərin böyük marağına səbəb olan Pedaqoji Universitetin stendində son illərdə universitetdə aparılan elmi-tədqiqatların nəticələrinin əks olunduğu kitablar, dövri-elmi jurnallar, ADPU-nun 100 illik yubileyinə həsr olunmuş silsilə əsərlər, reklam və məlumat materialları nümayiş olunub. Hər peşə və yaş səviyyəsindən olan iştirakçılara, o cümlədən regionun məktəbli gənclərinə ali təhsilin bütün səviyyələri üzrə ADPU-nun təklif etdiyi geniş təhsil xidmətləri haqqında məlumat verilib, ziyarətçilərə hədiyyələr təqdim olunub. Festival boyunca iştirakçılar kitab sərgilərində iştirak edib, düzgün ixtisas seçimi, təhsil tələbə kreditləri və s. ilə bağlı məlumatlandırılıb. Ümumilikdə festivala 5 minə yaxın iştirakçı qatılıb.

## Ümummilli Liderin yubileyinə həsr olunan voleybol yarışları

Mayın 11-də ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsinin (THİK) təşəbbüsü və təşkilatçılığı ilə Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunan fakültə komandaları arasında keçirilən oğlanlararası və qızlararası voleybol yarışları yekunlaşıb. Yarışda universitetin 9 fakültəsi üzrə qızlar arasında yarışda finalda birinciliyi Fizika fakültəsi, ikinciliyi Riyaziyyat fakültəsi, üçüncülüyü isə İbtidai təhsil fakültəsi, oğlanlararası yarışda isə birinciliyi Tarix və coğrafiya fakültəsi, ikinciliyi İncəsənət və fiziki tərbiyə fakültəsi, üçüncülüyü isə Kimya və biologiya fakültəsinin komandası qazanıb.

Mükafatlandırılma mərasimində ADPU-nun ümumi işlər üzrə prorektoru Tural Cəlilov, rektorun müşaviri Ümid Mehdiyev, ADPU THİK sədri dos. Vurğun Məmmədov və fakültə dekanları iştirak edib. Qalib komandalara kuboklar və medallar təqdim olunub.



## "Elmdə və təhsildə innovativ texnologiyalar" VII Beynəlxalq konqresi

May ayının 12-də ADPU-da Türkiyənin İqtisadi İnkişaf və Sosial Tədqiqatlar İnstitutu (İKSAD) ilə birgə keçirilən "Elmdə və təhsildə innovativ texnologiyalar" VII Beynəlxalq konqresinin açılış mərasimi keçirilib. Azərbaycan xalqının Ümummilli Lideri Heydər Əliyevin 100 illik yubileyinə həsr olunan hibrid formatda təşkil olunan beynəlxalq konqresə Azərbaycan, Türkiyə, Gürcüstan, Albaniya, Nigeriya, Mərakeş, Benin, Hindistan, Efiopiya, Moldova, Vyetnam və Portuqaliya daxil olmaqla ümumilikdə 12 ölkədən 150-dən çox tədqiqatçının 100-ə yaxın məruzələrinin tezisi qəbul olunub.




Açılış mərasimində, əvvəlcə, Azərbaycan Respublikasının Dövlət Himni və Türkiyə Respublikasının İstiqlal Marşı səsləndirilib, Ümummilli Lider Heydər Əliyevin və vətənimizin azadlığı uğrunda canlarından keçmiş şəhidlərimizin ruhları bir dəqiqəlik sükutla yad edilib. Açılış nitqi ilə çıxış edən ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov ənənəvi keçirilən bu önəmli konfransın hər il iki dəfə – bir dəfə Azərbaycanda, bir dəfə isə qardaş Türkiyədə təşkil edildiyini qeyd edib. Prorektor Azərbaycanda, ADPU-da keçirilən builki konqresin Ulu Öndər Heydər Əliyevin 100 illiyinə həsr olunmasının əhəmiyyətini vurğulayaraq, Heydər Əliyevin Azərbaycanda elm və təhsilin inkişafındakı misilsiz rolunu qeyd edib, eyni zamanda türk dünyasının böyük oğlunun türk dövlətləri arasında elmi-mədəni əlaqələrin təşəkkülündə də müstəsna xidmətlər göstərdiyini diqqətə çatdırıb.

A.Zamanov bu kimi tədbirlərin beynəlxalq elmi əlaqələrin inkişafı və innovativ elmi yanaşmaların inkişafına xüsusi töhfə verdiyini qeyd edib. O, konqresdə iştirak etmək üçün Azərbaycana gələn Tiflis Dövlət Tibb Universitetinin (TDTU) professor-müəllim və tələbələrindən ibarət nümayəndə heyətinə təşəkkürünü bildirib.

Çıxış edənlərdən ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru professor Mahirə Hüseynova "Heydər Əliyevin dil siyasəti", sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev "ADPU-nun pedaqoji kadr hazırlığında rolu" mövzularında fikirlərini bölüşüblər. ADPU-nun Elmi-Tədqiqat Mərkəzinin müdiri dosent Ərastun Mehdiyev son dövrlərdə ADPU-da aparılan elmi-tədqiqat işlərindən bəhs edərək, qabaqcıl elmi-pedaqoji təcrübənin tədqiqi və tətbiqi məqsədi ilə universitetin tədqiqatçılarının xarici ölkələrin, xüsusən, Türkiyənin elmi-tədqiqat strukturları və ali təhsil müəssisələrində araşdırmalar apardıqlarını qeyd edib. Gürcüstan nümayəndə heyətinin rəhbəri, TDTU-nun Elmi Tədqiqat və Bacarıqlar Mərkəzinin direktoru professor Luiza Gabunia da öz növbəsində beynəlxalq konqresin yüksək səviyyədə təşkilinə və qonaqpərvərliyə görə ADPU rəhbərliyinə minnətdarlığını ifadə edib. Qeyd edək ki, iki gün davam edən konqresin materiallarına sosial və humanitar elmlər, tibb elmləri, riyaziyyat, texniki elmlər, həmçinin fənlərin təlim və tədrisi ilə bağlı alim və tədqiqatçıların akademik araşdırmaları daxil edilib.

## Pedaqoji Kollecdə tədbir-tamaşa: Haqdan gələn səs – Dahi

Mayın 26-da ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunmuş "Haqdan gələn səs – Dahi" adlı tədbir-tamaşa keçirilib.

Tədbir iştirakçıları əvvəlcə Heydər Əliyevə həsr olunan rəsm əsərləri ilə tanış olublar. Kollecin akt zalında davam edən tədbirdə Ulu Öndərin zəngin həyat və fəaliyyətindən, Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə şanlı ordumuzun Vətən müharibəsində qazandığı böyük Zəfərdən bəhs edən videoçarxlar nümayiş etdirilib.

Daha sonra kollecin tələbələrinin rol aldıqları "Haqdan gələn səs – Dahi" adlı tamaşa təqdim olunub. Ümummilli Liderin mənalı həyatına, siyasi fəaliyyətinə həsr olunmuş tamaşa iştirakçılar tərəfindən böyük rəğbətlə qarşılanıb.

Tamaşadan sonra mərasim iştirakçıları qarşısında çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov yaradıcı heyəti təbrik edib, nümayiş olunan tamaşadan məmnunluğunu ifadə edib. Rektor bildirib ki, bu tamaşa zəngin ömür yolu ilə fəxr etdiyimiz Ulu Öndərin irsinin öyrənilməsi və təbliği baxımından çox əhəmiyyətlidir. Ulu Öndərin çoxşaxəli fəaliyyətinə nəzər salan C.Cəfərov ölkəmizin tarixində onun misilsiz xidmətlərindən bəhs edib. Çıxışının sonunda rektor tələbələrə elmi yenilikləri dərindən öyrənməyi, bilik və bacarıqları artırmağı, fəal və ləyaqətli vətəndaş olmağı tövsiyə edib.

Çıxış edən ADPK-nın direktoru dosent İsrayıl İsgəndərov rejissora və tələbə-gənclərə tamaşanın yüksək səviyyədə təqdimatına görə təşəkkür edib, Ulu Öndərin Azərbaycan xalqı və dövləti qarşısında əvəzsiz xidmətlərindən danışıb.



## Heydər Əliyevin 100 illiyinə həsr olunmuş olimpiadaların qalibləri müəyyənləşib



Mayın 26-da ADPU-da Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunmuş tələbələrin olimpiadalar və müsabiqənin qaliblərinin mükafatlandırma mərasimi keçirilib. İki mərhələdə keçirilən olimpiadalar və müsabiqənin yekun mərhələsində riyaziyyat, informatika, fizika, kimya, biologiya, Azərbaycan dili, Azərbaycan ədəbiyyatı, Azərbaycan tarixi, Azərbaycan coğrafiyası və ingilis dilindən olimpiadalar, təsviri incəsənətdən isə müsabiqədə ümumilikdə 95 tələbə iştirak edib.

Mükafatlandırma mərasimində ADPU-nun rektoru professor Cəfər Cəfərov açılış nitqi ilə çıxış edərək, bu kimi tədbirlərin keçirilməsinin əhəmiyyətini vurğuladı, tələbələrin olimpiada və müsabiqələrdə iştirakının onların hazırlıq səviyyələrinin artırılmasında önəmli rol oynayan vasitə olduğunu vurğuladı.

Mərasimdə çıxış edən ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov olimpiadalar və müsabiqənin təşkili və keçirilməsi haqqında geniş məlumat verib, bununla bağlı Təşkilat Komitəsinin yaradıldığını qeyd etdi. Ulu Öndər Heydər Əliyevin 100 illik yubileyi münasibəti ilə keçirilən tələbə olimpiadaları və müsabiqənin gedişindən danışan prorektor tədbirə fakültələrdə tələbələrin böyük marağının olduğunu qeyd elədi.

Daha sonra rektor elm sahələri üzrə olimpiadalar və təsviri incəsənətdən müsabiqədə I, II və III yer tutan tələbələri mükafatlandırdı. Qeyd edək ki, I yer tutan tələbələr 200 AZN pul mükafatı və diplom, II yer tutan tələbələr 150 AZN pul mükafatı və diplom, III yer tutan tələbələr isə 100 AZN pul mükafatı və diplomla mükafatlandırılıb.

Yekunda qalib tələbələrdən çıxış edənlər öz potensiallarını reallaşdırmaq üçün elmi-tədqiqat yönümlü layihələrin təşkilinin onların praktik inkişafına müsbət təsir etdiyini vurğuladılar.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ



AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ



# ƏN BÖYÜK MÜƏLLİMİMİZ MÜƏLLİMLİK MƏBƏDİNDƏ

## QAYIDAR

*Ağasən Bədəlzadə*
*Unudulmaz rəhbərimiz*

*Heydər Əliyevin ölməz xatirəsinə!*



Heydər Əliyevin ölməz xatirəsinə!
Doğuldu baharda bir bahar kimi,
Əgər bahardısa gedər, qayıdar.
Gül açdı yolları laləzar kimi,
Bu yol haq evinə yetər, qayıdar!!

Onun işığına sığınıb vətən,
Bir böyük tarixdir başından ötən,
Torpağın altına düşən qızıldan,
Torpağın üstündə bitər, qayıdar.

Od oldu qəlbinin çırpıntıları,
Ağlı, zəkasıydı dünyanın varı,
Buxara dönsə də çeşmə suları,
Qayıdar, yağışdan betər qayıdar!

Həmişə yaşayır, həmişə sağdır,
Ürəkdə məhəbbət, könüldə şahdır.
Torpağı, məzarı bir qibləgahdır,
Burdan dərd qayıdar, kədər qayıdar.

Ölüm haqq yolundan düşər didərgin,
Bir od parçasıydı o, sanki şərqin.
Ruhu üstümüzdə dolanır hər gün,
Haqqın dərgahından ötər, qayıdar.

Olub dərdimiz də, əzabımız da,
Olub günahımız, savabımız da,
Onun ki, ruhu var öz qapımızda,
Dərd gələr qapıya qədər qayıdar!

Gün kimi gəlmişdi, Günə döndü də,
Gün oldu bizimçün, yerə endi də.
Heydər bir Günəşdir elə indi də,
Baxma Gün qürubda itər, qayıdar.

Kim-kimdir bilərdi o, bircə anda,
Kölgələr birləşər Günəş batanda.
Kölgələr qaralıb, haqqa çatanda,
Günəş kölgələri ütər qayıdar.

Qaytardı bir böyük Elin adını,
Sabirlər yetirən dilin adını.
Məhəbbətlə çəkək, gəlin, adını,
Ruhu haqq dərgahın öpər qayıdar.

O Gündür, bu gündən qabaq olsa da,
O, haqdır, bu dünya nahaq olsa da.
Torpağa qarışıb, torpaq olsa da,
Dönər bir Günəşə Heydər qayıdar.

Dahi bu dünyaya gələr, o getməz,
Bir canı itsə də, nişanı itməz.
Dahilərin yolu məzarda itməz,
Çəkər o, məzara çəpər, qayıdar.

Millət bir gün düşər haqqın izinə,
Peşiman olanlar döyər dizinə.
Millət haçan dönüb gəlsə özünə,
Bax ... Heydər o vaxta qədər qayıdar.

Bir ümman içində kiçik bir ada,
Gör necə tanındıq ancaq dünyada.
İşığı gecələr versə də bada,
İşıq bu zülməti örtər, qayıdar.

Günəş də səmtindən çıxmaz qırağa,
Onun nuru dönər yanar çırağa.
Kamil bağban olsa solan bir bağa,
O bağa yenə bar, bəhər qayıdar.

Bir ömür dolanıb başa yetsə də,
Ömrün izi qalar, yolu bitsə də,
Bir dağın sinəsi uçub getsə də,
Itməz, ləl qayıdar, gövhər qayıdar.

Kəsilər həsrəti intizarının,
Bahar haq yoluna ömür barının,
Dönər düz yoluyla yadigarının,
Getməz heç vaxt hədər, qayıdar.

Bizə loğman oldu dərd illərində,
Açıldı qıfılı lal dillərin də.
Dönər milyonların könüllərində,
Qoç rəhbər atası rəhbər qayıdar.

*01.05.2005*






















*Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı" MMC-də çap olunub. Sifariş №: 1492*

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.